6. Qarayev E.T. Azərbaycan XVIII əsr rus və Qərbi Avropa səyahlarının təsvirində. Bakı: ADPU, 2005, 160 s.
7. Yesai Həsən-Cəlalyan. Alban ölkəsinin qısa tarixi (1702-1722-ci illər). Ruscadan çevirənlər H. Dayıyev və V. Musayev. Önsöz müəllifi akademik Z.Bünyadov. Bakı: İşıq, 1992, 50 s.

*Научный руководитель: доктор философии по истории, доцент Наджафли, Тофиг Гумбет оглы*

**NƏCIYEV ELNUR RASIM OĞLU**
**(Bakı, Azərbaycan)**

## SƏFƏVİLƏR DÖVLƏTİNDƏ ƏHALİNİN DEMOQRAFİK TƏRKİBİ

Əhalinin demoqrafik tərkibinin öyrənilməsində ailə, yaş, cins tərkibinin təhlili mühüm yer tutur. Onun say dinamikasını təxmini də olsa müəyyənləşdirmək üçün ailə başına düşən adamların sayı orta hesabla 5 nəfər götürülür. Lakin bəzi mənbələrdəki məlumatlar tamam fərqli bir fikir formalaşdırır. Xüsusilə də Jan Şarden, Oruc bəy Bayat, Kakaş və Tektanderin Səfəvilər dövlətində ailə münasibətləri ilə bağlı qeydləri bu baxımdan maraq doğurur [3; 5; 6; 8; 9]. Jan Şarden yazırdı ki, "Müsəlmanların evlənmək məsələsinə gəldikdə, bütün başqa Məhəmmədilər kimi, onların da Əli ehkamlarına əməl etdiyi müşahidə edilir. Onlarda üç cür evlənmə vardır: pulla almaq (kəniz saxlamaq – E. N.), kirə ilə (siğə yolu ilə – E. N.) almaq və ya evlənmək (nigah kəsdirməklə – E. N.). Bu üç evlənmə üsuluna birlikdə əməl etməyə icazə verilir" [9, s. 261]. Buradan belə aydın olur ki, nigah kəsdirməklə ailə quran şəxsin eyni vaxtda kəniz saxlamaq və kirə ilə arvad almaq hüququ da vardı. Ortabab və varlı ailələrdə bu evlənmə üsullarından hər birinə rast gəlinirdi. Yoxsul ailələr isə adətən kəbin kəsdirməklə ailə həyatı qururdular. Əgər problemə ailənin sosial statusu və nüfuzu baxımdan yanaşsaq ailəbaşına düşən nəfər sayının varlı və ortabab ailələlərdə kifayət qədər yüksək olması qənaətinə gəlmək olar.

Səfəvilər dövlətində kəniz, kirə ilə saxlanan və nigaha girilən qadınlar barədə geniş məlumat verən J.Şarden onların ailə münasibətlərində yeri barədə belə yazırdı: "qul qadınlar kəniz adlanır. Qanun icazə verir ki, saxlaya bildiyin qədər kəniz saxlayasan. Kənizin sahibinə arvadlıq eləməsi Şərqdə qətiyyən şərəfsizlik hesab olunmur. Belə ki, sahibi ilə bir yastığa baş qoyan kəniz üçün ayrıca mənzil verilir. Onu qullardan ayırırlar, yaxşı geyindirirlər. Ona xidmətçilər, müavinət verirlər. Uşağı olarsa, bütün bu üstünlükləri bir az da artır, ona daha qul kimi deyil, evin qanuni varisinin anası kimi baxırlar" [9, s. 262]. "Kirə ilə saxlanan qadınlara Amuadi-Mutaa deyirlər, mənası "oynaş", "məşuqə" eyni zamanda "xidmətçi", "qulluqçu" deməkdir. Belələrini istədikləri qədər istədikləri müddət ərzində və razılaşdırılmış qiymət əsasında saxlayırlar. Bu cür evlənmə, tamamilə mülki müqavilə əsasında hakimin qarşısında həyata keçirilir. Başqa evlənmə müqavilələri kimi yaxşı, qanunauyğun nəcib iş hesab edilir. Əgər tərəflər razılığa gəlsələr vaxtın qurtarmasına baxmayaraq, evlənmə müqaviləsi

təzələnir. Onlar müqaviləni vaxtından qabaq pozmaqda, kirə ilə saxladıqları qadını qaytarmaqda sərbəstdirlər" [9, s. 262-263]. Şardenə görə, "Qanuni arvadlar "Nekaa" (nigahlı – E. N.) adlanırlar. Məhəmməd dini onlardan dördünü saxlamağa icazə verir... iki səbəb üzündən bir nigahlı arvad saxlayırlar. Birincisi, ailə təsərrüfatının pisliyi qanuniləşdirilmiş arvadların çoxunun bir binada yaşamasına səbəb olur. Çünki arvadlardan hər biri evdə əmr vermək istəyir, onların bir-birinə qarşı olan qısqanclığı evi alt-üst edir. İkincisi, iqtisadi səbəbdir və ya qənaətcillikdir. Farslarda (yerli əhali nəzərdə tutulur – E. N.) evlənmək böyük xərc tələb edir. Bəzən də adamları var-yoxdan çıxarır. Bunu öhdəsinə götürməyə razılaşan adamlar da var. Bəziləri məşuqə və ya qul saxlamaqla kifayətlənirlər. Varlı adamlar, adətən, özlərinə uyğun ailələrdən arvad alırlar. Əgər aldıqları nigahlı arvad onları yarıtmazsa (bədbəxtlikdən həmişə belə olur), onlar qul qadınlarından istifadə edirlər. Bundan ailənin əmin-amanlığı qətiyyən pozulmur, çünki nigahlı qadın həmişə evin xanımı və sahibəsi olaraq qalır. Adətən, ortabab adamlar lazım gəldikdə çətinliklə qarşılaşmamaq üçün kirə ilə arvad saxlayırlar. Kiçik adamlar adətən, əksinə olaraq, nadir hallarda kirə ilə arvad saxlayırlar. Nüfuzlu adamlar isə qətiyyən kirə ilə arvad saxlamırlar; istəmirlər ki, onlara xidmət etmiş qadın sonradan kiminsə kirəçisi olsun. Nüfuzlu adamlar, xüsusilə nüfuzlu qadınlar və ya böyük ailələrdən çıxmış xanımlarla evlənirlər ki, valideynləri qınağa məruz qalmasınlar" [9, s. 263-265]. Səfəvilər dövlətində evlilik mərasimini də təsvir edən J.Şarden bu mərasimin adətən nümayəndə və ya vəkil vasitəsilə həyata keçirildiyini, müqavilə bağlandığını qeyd edirdi: "Müqavilə bağlanması (kəbinkəsmə – E. N.) mərasimi hər iki tərəfin nümayəndələri və bir ruhani şəxsin iştirak etdiyi bir otaqda keçirilir. Adətən ruhani şəxs müqaviləni bağlayır. Tərəflər yuxarı təbəqədən olduqda müqavilə bağalamaq üçün şeyx ül-islamı dəvət edirlər. Orta təbəqədən olanlar çalışırlar ki, kəbin kəsməyə ölkənin şeyx ül-islamının müavini olan qazini dəvət etsinlər. Adi və aşağı təbəqəyə mənsub olanlar isə kəbin kəsmək üçün məclisə bir molla və ya fəqihi dəvət edirlər. Gəlin bir neçə qadınla bir otağa və ya kəbinkəsmə otağına daxil olur. Bu vaxt hər iki tərəfin nümayədələri ayağa durur...sual-cavabdan sonra tərəflər arasında kəbin kəsilir, kəbin kağızı möhürlənir. Kəbinkəsmədə iştirak edən tərəflər də ona möhür vurub imzalayırlar. Sonra onu gəlinin vəkilinə təhvil verirlər. Kəbin kağızı gəlində qalır. Ümumiyyətlə, ən azı 10 nəfər kəbin kağızının düzgünlüyünü təsdiq etməlidir. Siğə edilmiş qadınların da kəbin mərasimi eynilə daimi ərə gedən qadınların kəbin mərasimi kimidir, yalnız bir fərqlə ki, hər iki tərəfin vəkili kəbin şərtlərini başqa şərtlərlə ifadə edirlər. Kəbinin müddətini, qiymətini, siğə olmasını bəyan edirlər" [9, s. 265-266]. "Onlar alacaqlarıqadınları əvvəlcədən görüb danışdırmadıqları üçün ən çox özlərinkilərlə(qohumlarla – E. N.) evlənirlər" [9, s. 271].

Evliliklə yanaşı boşanma barədə də məlumat verən fransız səyyah qeyd edir ki, "İslam qaydalarına əsasən hər hansı bəhanə ilə arvadı boşamaq mümkündür. Bunun üçün kifayətdir ki, tərəflərdən biri başqasının dadına baxsın və ya arvad boşanmaq istəsin. Onlar dünyanın ən ağıllı və ən nəcib adamları olsalar belə boşanırlar. Məhkəmə və ya ruhani qarşısında ayrılıq aktı bağlanır. Bu akt-talaq, yəni boşanma kağızı adlanır. Talaq verilən kimi, tərəflər istədikləri ilə evlənmək sərbəstliyinə malik olurlar. Əgər kişinigahın ləğv edilməsinə könüllü olaraq razıdırsa, arvada mehr verməyə məcburdur. Əgər ayrılığın səbəbkarı arvaddırsa, heç bir şey iddia edə bilməz. Məhəmmədilər

pozulmuş nigahın təzələnməsini qanunauyğun hesab edirlər. Nigahüç dəfə pozula və təzələnə bilər" [9, s. 271-272].

Oruc bəy Bayat da avropalı səyyahların dediklərini demək olar ki, təsdiqləyir. Səfəvi elçisi yazır ki, "xalqın yaşayışı, xüsusilə də ənənəvi mərasimlər demək olar ki, digər Muhəmmədi və Ərəb xalqlarının yaşayışındakı kimidir. Perslərin (Səfəvilərin– E. N.) nüfuzlu ailələlərin kişiləri çoxarvadlı olmağı xoşlayırlar. Əslində ala bildikləri qədər arvad alırlar. Lakin sıravi bir nəfər üçün sadəcə yeddi qadın uyğundur və yalnız yeddi qadına icazə verilir. Digər tərəfdən də boşanma gündəlik təcrübələrdən biridir" [3, s. 71; 6, s. 36; 8, s. 49]. Tektander də yazır ki, "Onlarda nigah çox asandır, onlar saxlaya bildikləri qədər qadına malik olurlar" [5, s. 37].

Səfəvilər dövlətində əhalinin demoqrafik tərkibini müəyyən etmək üçün Osmanlı dəftərlərinən başqa müraciət ediləcək ikinci bir etibarlı qaynaq yoxdur. Bu dəftərlər də müəyyən müddətə də olsa yalnız Osmanlı nəzarəti altına düşən əraziləri təhrir etdiyinə görə Səfəvi əhalisinin yalnız bir qisminin demoqrafik tərkibi barədə məlumat əldə etmək olur. Təhrir sistemində şəxslər bir xananı (evlini) təmsil edərək qeyd edilir. Bundan başqa subaylar isə xüsusi bir işarə ilə evlilərdən fərqləndirilir. Halil İnalcıka görə, xana (evli) iqtisadi müstəqilliyi olan bir ailəni təmsil edirdi [7, s. 25]. Subayları nəzərdə tutan mücərrədləri ümumi saydan çıxdıqda yerdə qalan ev sayının hansı rəqəmə vurulması ilə bağlı tarixçilər arasında fərqli fikirlər müdafiə edənlər olmuşdur. Həmin fikirlərə əlavə olaraq qeyd edək ki, M.A. Kuk adlı tədqiqatçı təhrir dəftərlərinə istinadən ümumi əhalinin sayının müəyyənləşdirilməsində mücərrədlərin (subayların) orta hesabla 3 nəfərə, evlilərin isə təxminən 4,5 nəfərə bərabər olması fikrini müdafiə edirdi. Lakin biz bir çox tədqiqatçılar kimi evlilər üçün 5 nəfəri qəbul etmişik. Buna səbəb də sadəcə həmin rəqəmə üstünlük verənlərin daha çox olmasıdır [2, s. 185]. Misal üçün, Çuxursəəd bəylərbəyiliyinin İrəvan qəzasının əhalisi bağlı tərtib edilən dəftərlərdən məlum olur ki, XVI əsrin sonlarında İrəvan şəhərində 403 xanə və 3 mücərrəd vardı. Bu da o deməkdir ki, subay əhali cəmi 3 nəfər təşkil edirdi [1, s. 12]. Bunu aşağıdakı cədvəllərdə daha təfərrüatlı şəkildə görmək olar. Lakin, yenə də qeyd etmək lazımdır ki, bu bir çox tədqiqatçıların qənaətidir və bu sahədə deyilən son söz deyildir.

**Cədvəl 1: 1590-cı il tarixli təhrirə görə Rəvan qəzasının məhəllələri və əhalisinin ailə vəziyyəti**

| **Məhəllənin adı** | **Müsəlman əhalinin ailə vəziyyəti** | | **Qeyri-müsəlman əhalinin ailə vəziyyəti** | |
|---|---|---|---|---|
| | **Evli** | **Subay** | **Evli** | **Subay** |
| Nəfsi-Rəvan | **29** | **-** | **-** | **-** |
| Marderos | - | - | 88 | 1 |
| Mirzə | - | - | 46 | 2 |
| İsalı | - | - | 51 | - |
| Börkçü Ohan | - | - | 54 | - |
| Dərəköy | - | - | 41 | - |
| Kiçik | - | - | 94 | |

| | | | | |
|---|---|---|---|---|
| Kaykı | | | | |
| **Cəmi** | 29 | - | 374 | 3 |

Kəndlər üzrə də eyni hal müşahidə olunur. Belə ki, 89 kənddən 25-i üzrə 841 evli, 4 subay qeydə alınmışdı. Digər kəndlər barədə hər hansı bir məlumat verilmir. 25 Kənd üzrə onların paylanması aşağıdakı cədvəldə öz əksini tapmışdır [1, s. 13-14].

**Cədvəl 2: 1590-cı il tarixli təhrirə görə Rəvan qəzasında kəndlərin əhalisinin ailə vəziyyəti**

| | **Kəndlərin adı** | **Müsəlman əhalinin ailə vəziyyəti** | | **Qeyri-müsəlman əhalinin ailə vəziyyəti** | |
|---|---|---|---|---|---|
| | | **Evli** | **Subay** | **Evli** | **Subay** |
| | Nurekiğ (?) | 1 | - | 46 | - |
| | Göy Künbəd | 2 | - | 32 | - |
| | Yenicə | 4 | - | 3 | - |
| | Hacı İlyas | 10 | - | - | - |
| | Məzəkəvid (?) | 5 | - | 37 | - |
| | Ağcaperd (?) | 17 | 3 | - | - |
| | Cevriş | - | - | 18 | - |
| | Kənəgir (?) | 18 | - | 220 | - |
| | Şahab (?) | - | - | 10 | - |
| 0 | Zakə (?) | - | - | 79 | - |
| 1 | Zakə Vanik (?) | - | - | 9 | - |
| 2 | Evan | - | - | 56 | - |
| 3 | Arınç | - | - | 71 | - |
| 4 | Türək (?) | - | - | 37 | - |
| 5 | Geturen (?) | - | - | 8 | - |
| 6 | Erzaki (?) | 2 | - | 25 | - |
| 7 | Nornos (?) | - | - | 25 | - |
| 8 | Yağavart (?) | - | - | 29 | - |
| | Kameris | - | - | 16 | - |

| | | | | | |
|---|---|---|---|---|---|
| 9 | | | | | |
| 0 | Eylaz | - | - | 9 | - |
| 1 | Yelqovan | - | - | 25 | - |
| 2 | Tacir bəy | 4 | - | 14 | - |
| 3 | Tutul (?) | 3 | 1 | - | - |
| 4 | Həsən Avar | - | - | 3 | - |
| 5 | Cəbəcilü | - | - | 3 | - |
| | **Cəmi** | 66 | 4 | 775 | - |

Bütövlükdə Səfəvilər dövləti üzrə əhalinin demoqrafik vəziyyətinin öyrənilməsi mənbələrin yetərsizliyinə və əldə olanların da bir çoxunun hələ tədqiq edilməməsinə görə müşküldür. Xatırladaq ki, Osmanlıların XVIII əsrin əvvəllərində Səfəvi torpaqlarını növbəti işğalı sonrası bu bölgə üçün tərtib etdikləri dəftərlər bütövlükdə Səfəvilərin əhalisinin ailə vəziyyəti ilə bağlı daha ümumi təsəvvür yarada bilər. Osman Özgüdənli yazır ki, bu dəftərlər Ərdəbil, Maku, Təbriz, Xoy, Qapan, Qaradağ, Marağa, Soyuqbulaq, Ərdəlan, Kirmanşahan, Luristan və Həmədan sancaq və əyalətlərinin müfəssəl tapu təhrir qeydlərini ehtiva etməkdədir [4, s. 83]. Onun əsasən Qərbi İran üçün sadaladıqları ərazilərə əlavə olaraq, İrəvan, Naxçıvan, Gəncə-Qarabağ əyalətləri üçün tərtib etdikləri dəftərləri də qeyd edə bilərik. Yalnız bu dəftərlərin hər birinin tərcümə edilərək təhlil edilməsi sonrasında Səfəvilər dövlətinin demoqrafik tərkibi barədə daha mütəşəkkil bir fikrə gəlmək mümkün ola bilər.

Əhalinin demoqrafik tərkibinin öyrənilməsi üçün, onun cins və yaş tərkibinin də araşdırılması vacibdir. Lakin təəssüf hissi ilə qeyd etmək istərdim ki, əldə olunan mənbələr əhalinin cins və yaş tərkibini müəyyən etməyə də imkan vermir.

## İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYAT


1. Babacan H. 1590 (H.999) tarihli tahrir defteri'ne göre Revan kazası. Yüksek lisans tezi. Samsun, 1994, 153 s.
2. Koç Y. Ömer Lütfi Barkan'ın Tarihsel Demografi Çalışmalarına Katkısı ve Klasik Dönem Osmanlı Nüfus Tarihinin Sorunları/Bilig: Türk Dünyası Sosyal Bilimler Dergisi, 2013, sayı 65, s. 177-202
3. Kuzucular L.A. Elçilik katibinin kaleminden Safeviler. Oruç bey (Don Juan). 1560-1604. Ankara: Yurt Kitab-Yayın, 2014, 320 s.
4. Özgüdenli O.G. Osmanlı İranı: Batı İran ve Azerbaycan tarihi hakkında Osmanlı tahrir kayıtları: Coğrafi ve İdaritaksimatı./Ankara Üniversitesi Dil ve Tarih-Coğrafya Fakültesi Tarih Araştırmaları Dergisi 22/34, 2003, s. 83-107
5. Какашъ и Тектандеръ. Путешествіе въ Персію черезъ Московію 1602-1603

гг. Переводъ съ нѣмецкого Члена-Соревнавателя А.И.Станкевича с.1-54/ Чтенія въ Им-ператорскомъ Обществѣ Исторіи и Древностей Россійскихъ при Московскомъ Универси-тетѣ. 1896 годъ. Книга вторая. Сто семьдесятъ седьмая. Издана подъ завѣдываніемъ Е.В. Барсова. М.: Университетская типография, 1896, 597 с.
6. Россия и Европа глазами Орудж-Бека Баята – Дон Жуана Персидского. Перевод с англий-ского, введение у комментарии и указатели Октая Эфендиева и Акифа Фарзалиева. СПб: Издательство Санкт-Петербургского университета, 2007, 211 с.
7. An Economic and social history of the Ottoman Empire. Edited by Halil Inalcık with Donald Quataert. Volume I: 1300-1600. Cambridge University press, 1997, 480 p.
8. Le Strange G. Don Juan of Persia A Shi'ah Catholic 1560–1604. Publishers Harper & Brothers. New York and London. 1926, 355 p.
9. Voyages de M[a]. Le Chevalier Chardin, En Perse, Et Autres Lieux De L' orient. Tome second, Contenant le Voyage de Paris à Ispahan. Second partie, Qui comprend le Voyage de Mingrelin à Tauris. Amsterdam, Chez Jean Louis de Lorme, MDCCXI (1711), 372 p.

*Научный руководитель: доктор исторических наук, профессор Шукюров, Керим Карам оглы*

**НУРИДДИНОВ АБДУЛВОҲИД ОРИФХЎЖАЕВИЧ**
**(Наманган, Узбекистан)**

## ҚАДИМИЙ КОСОН ТАРИХИГА БИР НАЗАР

Мустақиллик шабадаси эсиши туфайли халқимизнинг асрлар давомида куртак ёзолмай қолган орзу-армон ғунчалари яшнаб гуллади. Миллий истиқлол нафақат иқтисодий жиҳатдан халқимиз равнақи учун қўш қанот бағишлади, балки маънавий ҳаётимизда жуда катта инқилобий ўзгаришларни вужудга келтирди. Истиқлол туфайли миллий маданиятимиз, унутилган қадриятларимиз, тарихимиз тикланмоқда, миллий шуур, истиқлол мафкураси шаклланмоқда, халқимизнинг минглаб йиллардан буён сақланиб келаётган эзгу урф-одатлари, расм-русумлари, шарқона ахлоқ-одоб қоидалари ҳаётимизда ўз ўрнини эгаллаб бормоқда. Хусусан, бой ўтмиш тарихимизнинг шонли саҳифаларини ўқиб-ўрганиш натижасида халқимиз ўзлигини англаб етмоқда, шўролар даврида унутилган улуғ алломаларимиз номини тиклаб, ҳақли равишда фахрланмоқда.

Қадимий ва навқирон Косонсой шаҳри узоқ ўтмишдан Косон номи билан маълум ва машҳур бўлган. У нафақат Фарғона водийсида, балки Марказий Осиёдаги кўҳна шаҳарлардан бири бўлиб, жуда кўплаб тарихчи олимлар, шарқшунослар диқатини ўзига жалб этиб келган. Таниқли тарихчи олимлар, мутафаккирлар, адиблар ўз асарларида бевосита ёки билвосита қадимий Косон тўғрисида маълумотлар беришган. Ўрта асрлардаги араб тарихшуносларидан